"Azərbaycan Dövlət Pedaqoji Universitetinin mətbu orqanı"

# GƏNC MÜƏLLİM QƏZETİ





ADPU 100

"Müəllimlər müəllimi olmaq ikiqat şərəfli və eyni zamanda, ikiqat məsuliyyətli işdir!"
H.Əliyev

## Prezident İlham Əliyevin Şuşadan Azərbaycan xalqına Novruz təbrikindən





"Bizim müharibəmiz – İkinci Qarabağ müharibəsi bu gün dünyanın aparıcı ölkələrinin hərbi məktəblərində öyrənilir. Biz XXI əsrin müharibəsini aparmışıq, düşməni məhv etmişik. Erməni ordusu yoxdur, biz onu məhv etmişik. Bu gün Novruz bayramını Cıdır düzündə qeyd edərkən qürur hissi ilə deyirəm: **"Şuşa, sən azadsan!", "Şuşa Azərbaycandır!", "Qarabağ Azərbaycandır!""**

### Elmi Şuranın növbəti iclası



səh. 2

### "Özümü biləndən qədrini bildim" - Quba filialında professor M.Nağıqızı ilə onlayn görüş




səh. 3

### ADPU-nun məşhur məzunları



səh. 5

### Universitetin şəhid məzununun ailəsi ziyarət edilib



səh. 2

### "ADPU TV" onlayn "YouTube" televiziyası fəaliyyətə başlayıb



səh. 4

### Tanınmış rəssam Rafiq Əzizin ADPU ilə bağlı xatirələri



səh. 6

### ABŞ-ın Azərbaycandakı səfiri ADPU-da olub



səh. 3

### Təhsil İnstitutunun direktoru ADPU-da olub



səh. 4

### ADPU THİK tələbələrə adlı təqaüd və internet paket dəstəyi verməkdə davam edir




səh. 7

Qəzet 1958-ci il, fevral ayının 1-dən etibarən nəşr olunur.

63

Mart, 2021 / № 03 (1106)

## Universitetin şəhid məzununun ailəsi ziyarət edilib



Martın 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Sosial və humanitar məsələlər üzrə prorektorunun köməkçisi Cavid Hüseynov, ADPU-nun Ağcabədi filialının tərbiyə işləri üzrə direktor müavini Mahir Səlimov, həmin filialın dekan müavini Xəyyam Bədəlov, ADPU-nun əməkdaşı Cahangir Süleymanov və ADPU-nun tələbə təşkilatlarının nümayəndəsi Asim İbrahimov Vətən müharibəsi şəhidi, ADPU-nun Ağcabədi filialının "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisası üzrə məzunu, baş leytenant Ağaqardaş Abbasovun yeni dünyaya gələn qızı İlknuru ziyarət ediblər.

Zərdab rayonunun Hüseynxanlı kəndində şəhid ailəsinin qonağı olan universitet nümayəndələri şəhidin atası İlham Abbasovla həmsöhbət olublar. O, qonaqlara Ağaqardaşın vətənpərvərliyindən söz açaraq xatirələrini bölüşüb, övladının öz doğum günündə, sentyabrın 28-də şəhid olduğunu bildirib.

ADPU-nun nümayəndəsi C.Hüseynov rektor, professor Cəfər Cəfərov başda olmaqla universitet rəhbərliyi adından şəhid ailəsinə ehtiramını bildirib, Vətən müharibəsində şəhid və qazi olan bütün tələbə və məzunların daim diqqətdə olduğunu vurğulayıb. O, ADPU rəhbərliyinin şəhidimizin bu yaxınlarda dünyaya gələn övladı İlknura olan dəyərli hədiyyələrini, şəhidlər haqqında materialların dərc olunduğu universitetin "Gənc müəllim" qəzetinin saylarını ailəyə təqdim edib. Bildirilib ki, balaca İlknur daim ADPU rəhbərliyinin diqqəti və himayəsində olacaq, əgər o da atası kimi müəllimlik peşəsini seçərsə, ADPU İlknur balamıza tam dəstək olacaq.

Sonra M.Səlimov Ağcabədi filialında təhsil aldığı dövrdə Ağaqardaşın nümunəvi davranışından, vətənpərvər mövqeyindən söz açıb. Şəhidin atası göstərilən diqqət və qayğıya görə ADPU rəhbərliyinə təşəkkürünü bildirib.

## "Bu gün təhsildə nələr dəyişməlidir" mövzusunda dəyirmi masa



Martın 4-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) Təhsil Nazirliyi yanında İctimai Şuranın (İŞ) "Bu gün təhsildə nələr dəyişməlidir" mövzusunda dəyirmi masası keçirilib.

Tədbiri açan universitetin rektoru, professor Cəfər Cəfərov ali təhsil müəssisəsində son 5 ildə aparılan islahatlar və keyfiyyət dəyişikliklərindən danışıb. Rektor ADPU tələbələrinin yüksək akademik göstəricilər, universitet məzunlarının müəllimlərin işə qəbulu imtahanlarında əldə etdikləri yüksək nəticələr haqda statistik məlumatları diqqətə çatdırıb. O, həmçinin ADPU-nun 100 ilin elm və təhsil məbədi kimi ölkənin təhsil və pedaqoji sferasında oynadığı rolu xüsusi vurğulayaraq hazırda universitetin Bakıdakı 4 kampusu və bölgələrdəki 5 filialı ilə böyük şəbəkəyə malik olduğunu qeyd edib. 100 ilin ənənələrinin müasir dövrün tələblərinə uyğun yaşadılması və ADPU-nun tədqiqat universitetinə çevrilməsi üçün aparılan sistemli işlərdən bəhs edən rektor son zamanlar universitetdə inzibati və pedaqoji vəzifələrin tutulmasında şəffaf seçkilər üsulunun tətbiq edildiyini vurğulayıb.

C.Cəfərov pandemiya dövründə ADPU-da tədrisin məsafədən təşkili ilə bağlı görülən işlər və tədrisin rəqəmsallaşdırılması sahəsində əldə olunan uğurlardan danışıb.

Tədbirdə İŞ-in sədri, professor Şahlar Əsgərov, təhsil nazirinin müşaviri Elnur Nəsibov, İctimai Şuranın üzvləri, universitet nümayəndələri mövzu ətrafında çıxışlar edib, müzakirələr aparıblar.

Çıxışlarda və müzakirələrdə təhsil sahəsində gedən qlobal dəyişikliklərdən, bu məsələyə Azərbaycan dövlətinin strateji yanaşması və təhsilə dair dövlət proqramları haqqında məlumat verilib. Son bir ildə pandemiya ilə bağlı yaranan vəziyyətdə distant təhsil texnologiyalarının tətbiqi məsələlərindən danışılıb.

## Elmi Şuranın növbəti iclası

Universitetin Elmi Şurasının (EŞ) növbəti onlayn iclası keçirilib. İclasda ADPU-nun rektoru, EŞ-in sədri, professor Cəfər Cəfərov pandemiya şəraitində tədrisin təşkili və tələbələrin ictimai-sosial aktivliyi, inzibati idarəetmə, Vətən müharibəsində şəhid və qazi olan ADPU-nun tələbə və məzunları və onlarla bağlı görülən işlər barədə ətraflı məlumat verib. Rektor ADPU-nun "2018-2021-ci illər üçün inkişaf strategiyası" çərçivəsində icra edilən, eləcə də görüləcək işlər haqqında danışaraq universitetin maddi-texniki resurslarının səmərəli istifadəsi məsələlərinə toxunub. Müəllim peşəsinin nüfuzunun artırılması yönündə aparılan sistemli dövlət siyasəti nəticəsində ADPU-nun da böyük irəliləyişlər əldə etdiyini vurğulayan prof. C.Cəfərov hazırda universitet tələbələrinin təxminən 70 faizinin təqaüd aldığını bildirib. Universitetdə yeni tədris metod və texnologiyalarının tətbiq olunduğu eksperimental qrupların faydaları, elektron kitabxananın yenilənmiş və daha funksional variantı üzərində iş, o cümlədən beynəlxalq əməkdaşlığın əhatə dairəsinin artırılması məsələləri də rektorun çıxışında xüsusilə qeyd olunub.



Tədris işləri üzrə prorektor dosent Eldar Aslanov uğurla yekunlaşan onlayn qış imtahan sessiyası haqqında statistik təhlilləri diqqətə çatdırıb. Qeyd edilib ki, ADPU-da cari tədris ilində qış imtahan sessiyasına buraxılan bakalavr və magistrantların sayı ümumilikdə 13759 nəfər olub. Onlardan 10200-ü Bakı şəhərindəki kampuslarda, 3559 nəfəri bölgələrdəki filiallarda təhsil alanlardır. İmtahan qərargahına elektron qaydada 145 müraciət daxil olub, hər bir müraciət araşdırılaraq müvafiq qərarlar qəbul edilib. Qış imtahan sessiyası ilə bağlı tələbələrlə aparılan onlayn sorğuda 614 tələbə iştirak edib.

Eldar Aslanov yaz semestrində qarşıda duran vəzifələr və imtahan sessiyasına hazırlıqla bağlı məlumat da verib. Bildirib ki, hazırda universitetin 4488 tələbəsi onlayn qaydada təcrübəyə cəlb edilib. Orta ümumtəhsil məktəblərində karantin rejiminin tələblərinə uyğun olaraq əyani təcrübənin təşkili hələ ki mümkün deyil, lakin təcrübəçi tələbələr üçün onlayn qaydada bütün şərait yaradılır. E.Aslanov universitetin məzunlarının əmək bazarında məşğulluq nisbəti haqqında hesabatı təqdim edərək ümumi statistik mənzərəni diqqətə çatdırıb.

Ümumi işlər üzrə prorektor Tural Cəlilov qış imtahan sessiyasında Apelyasiya Komissiyasının haqqında ətraflı məlumat verib. Qeyd edib ki, ümumilikdə 391 tələbə apelyasiya müraciəti edib. Onların 336-nın müraciətlərinə öz iştirakları ilə onlayn qaydada baxılıb, nəticələr protokollaşdırılıb. Tələbələr nəticələrdən razı qalıblar. Apelyasiya baxışlarının videoyazısı arxiv materialı kimi saxlanılıb. 55 tələbə apelyasiya baxışından əvvəl ərizəsini geri götürüb.

Elm və innovasiyalar üzrə prorektor professor Asəf Zamanov elmi və tədqiqat işlərinin yazılmasının yeni qaydaları haqda ətraflı məlumat verərək yeniliklərin universitetdə aparılan elmi tədqiqatların daha da inkişaf etdirilməsi və praktikliyinə əsas verəcəyini vurğulayıb.

Sosial və humanitar məsələlər üzrə prorektor professor Fikrət Rzayev müəyyən struktur təkmilləşdirilmələri haqqında təqdimatla çıxış edib.

## ADPU-nun ötənilki məzunlarının 51,5 faizi hazırda işləyir

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) əmək bazarına çıxan ötənilki məzunlarının 51,5 faizi hazırda işləyir. Bu haqda Elmi Şuranın martın 5-dəki növbəti iclasında ADPU-nun Tədris işləri üzrə prorektoru dosent Eldar Aslanovun təqdim etdiyi hesabatda məlumat verilib. Sənəddə ADPU məzunlarının əmək bazarında məşğulluq nisbəti ilə bağlı statistik məlumatlar yer alır.




Hesabata əsasən, 2019-2020-ci tədris ilində universitetdən 2099 nəfər bakalavriat səviyyəsindən məzun olub. Onların 14 faizi magistratura səviyyəsinə qəbul olub, 7.1 faizi həqiqi hərbi xidmətə yollanıb. 61.7 faiz məzun isə (1650 nəfər) əmək bazarına çıxıb. Bu məzunların 677 nəfəri Müəllimlərin İşə Qəbulu (MİQ) imtahanında iştirak edib ki, onların 51.2 faiz 50-60 bal arasında nəticə göstərib. Ümumilikdə imtahan verənlərin 64 faizi ixtisası üzrə işə qəbul olunub. Digər məzunların əksəriyyəti dövlət və özəl sektorda fəaliyyətə başlayıb. Ümumilikdə ADPU-nun əmək bazarına çıxan ötən ilki məzunlarının 51.5 faizi (851 nəfər) hazırda təhsil müəssisələri, dövlət və özəl sektorlarda işləyirlər. Universitetin ötənilki məzunlarından 52 nəfəri Vətən müharibəsi iştirakçısıdır.

## "Özümü biləndən qədrini bildim" - Quba filialında professor M.Nağıqızı ilə onlayn görüş

Martın 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında "Zoom" platforması üzərindən çağdaş Azərbaycan poeziyasının sevilən şairəsi, tanınmış alim, professor, Azərbaycan Yazıçılar Birliyinin (AYB) üzvü, ADPU-nun Filologiya fakültəsinin dekanı Mahirə Nağıqızına həsr edilən "Özümü biləndən qədrini bildim" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun Filologiya fakültəsinin professor-müəllim heyəti, əməkdaşları, Quba filialının müəllim və tələbə kollektivi iştirak edib.




Görüşdə Prof. M.Nağıqızı qeyd edib ki, gənclərin inkişafında əməyimizin olması bizləri sevindirir, bizlər Həsən Mirzəyev kimi dəyərli alimlərimizdən öyrəndiklərimizi gənc nəslə ötürməliyik. Həmçinin Mahirə xanım onu da bildirib ki, bu gün onun alim, şairə və insanların çətin və xoş günündə hər zaman yanlarında olan bir şəxsiyyət kimi yetişməsinin səbəbi anası Nazlı xanımdır. Buna görədir ki, əsərlərinin çox hissəsində ana məhəbbəti, ana zəhməti ön plandadır.

Filialın direktor müavini Aysel Şeydayeva qeyd edib ki, şairənin yaradıcılığında vətən mözusu xüsusi yer tutur. Bunu Vətən müharibəsi dövründə professorun fəaliyyətinə nəzər salanda aydın görmək olar.

Tədbirdə filialın direktoru dos. Y.Alıyevin təşəbbüsü və filial Elmi Şurasının qərarı ilə Mahirə xanım "Çağdaş Azərbaycan poeziyasının inkişafında xidmətlərinə və vətənpərvərlik hissinin təbliğinə görə" Fəxri Fərmanla təltif edilib. Həmçinin 8 Mart - Beynəlxalq Qadınlar Günü münasibətilə tələbələrin çəkdikləri M.Nağıqızının rəsmlərindən ibarət kolleksiya hədiyyə kimi təqdim edilib.

Tədbirdə kafedra müdiri dosent Gülşən Ağabəy, baş müəllimlər Rahib Sədullayev, Eyvaz Şeydayev çıxışlarında professorun elmi və bədii yaradıcılığını hərtərəfli təhlil edərək görüşün gənclərə böyük vətənpərvərlik ruhu aşıladığını vurğulayıblar. Tədbir Nicat Piriyevin (TGT sədr müavini) tarda "Qarabağ şikəstəsi" ifası ilə sona çatıb.

## ADPU-da fəlsəfə fənnindən doktoranturaya qəbul imtahanları keçirilib

Azərbaycan Respublikası Təhsil Nazirliyinin "Fəlsəfə fənnindən doktoranturaya qəbul imtahanının keçiriləcəyi ali təhsil müəssisələrinin müəyyən edilməsi barədə" 6 sentyabr 2020-ci il tarixli, F-436 nömrəli və ADPU-nun 10 mart 2021-ci il tarixli, 3/20 nömrəli əmrlərinə əsasən 11 və 12 mart 2021-ci il tarixlərində ADPU-da Elm və innovasiyalar üzrə prorektorluğun təşkilatçılığı ilə fəlsəfə fənnindən doktoranturaya qəbul imtahanları keçirilib. İmtahanda 7 ali təhsil müəssisəsindən (ADPU, ADU, BSU, ADRA, ADMİU, LDU və Təhsil İnstitutu) doktoranturaya qəbul üçün sənəd verən iddiaçılar (50 nəfərdən 46-sı) iştirak etmişdir. Bu imtahandan məqbul qiymət alanlar növbəti mərhələdə - ixtisas fənnindən qəbul imtahanlarında iştirak edirlər.

## ABŞ-ın Azərbaycandakı səfiri ADPU-da olub

*Martın 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) bu ali təhsil ocağı ilə "Birgə və Sağlam" İctimai Birliyi arasında əməkdaşlığa dair anlaşma memorandumunun imzalanma mərasimi keçirilib. Tədbir ABŞ-ın Beynəlxalq İnkişaf Agentliyinin (USAID) maliyyə, Qara Dəniz Əməkdaşlıq Təşkilatının (Black Sea Trust GMF) təşkilati dəstəyi ilə reallaşan "Hər kəs üçün bərabər təhsil hüquqları" layihəsi çərçivəsində keçirilib.*

ADPU-nun rektoru, professor Cəfər Cəfərov vurğulayıb ki, 100 illiyini qeyd edən universitet ölkədə xüsusi təhsil sahəsində kadr hazırlığının bazasıdır. ADPU xüsusi və inklüziv təhsilin inkişafı istiqamətində bir çox beynəlxalq layihələrə imza atıb. Bunlara misal olaraq ADPU-da ölkədə inklüziv təhsilə aid ilk pilot layihəni (2011-2012-ci illər), Regional İnkişaf İctimai Birliyinin keçirdiyi "Müəllimlərin inklüziv təhsil sahəsində bacarıqlarının artırılması" layihəsini, "İşarə lüğəti"nin hazırlanması, UNICEF Azərbaycanın "Azərbaycanda əlilliyi olan uşaqlar üçün inklüziv təhsilin genişləndirilməsi" layihəsini, Təhsil Nazirliyi ilə birgə "Korreksiyaedici təlimçi" ixtisası üzrə peşə standartı və tədris materialları hazırlanmasını göstərmək olar.

Ümumən, ali təhsil ocağı sağlamlıq imkanları məhdud şəxslərin reabilitasiya və sosiallaşmalarında fəal iştirak edir. Universitet ABŞ-ın Bakıdakı səfirliyinin dəstəyi ilə də bir çox layihələrə imza atıb. Bir il öncə Corc Vaşinqton Universiteti ilə beynəlxalq ikili diplom proqramı üzrə müqavilə imzalayıb.

"Birgə və Sağlam" İctimai Birliyinin sədri Aytən Eynalova çıxışında ictimai birliyin ölkədə autizmli uşaqların reabilitasiyası sahəsində öncül mərkəz olduğunu vurğulayıb. Qeyd edib ki, İB-nin yaratdığı "KAŞALATA kafe" belə uşaqların özünü reallaşdırması üçün ölkəmizdə ilk və yeganə nümunədir. Beynəlxalq və akademik əməkdaşlığa önəm verən birlik bu günə qədər ABŞ-ın, Türkiyənin müvafiq mərkəzləri ilə bir çox layihələr icra edib.



Memorandum çərçivəsində ADPU-nun Davamlı təhsil və innovasiyalar şöbəsi ilə birgə 40 yerli mütəxəssisin hazırlanması, xarici təlim proqramının lokallaşdırılması və onlayn portalın inkişafı nəzərdə tutulur.

Sonra tərəflər memorandumu imzalayıblar.

ABŞ-ın Azərbaycandakı səfiri Li Litzenberqer autizmli şəxslərin reabilitasiyasının vacibliyini və bu şəxslərə imkan yaradılarsa, onlar içərisindən dahilər yetişə biləcəyini vurğulayıb. "Görüşlərimi son vaxtlar onlayn keçirsəm də, məhz belə bir tədbirdə canlı iştirak etməyi vacib bildim. A.Eynşteyn, B.Fişer kimi dahilər də məhz belə şəxslər idi", - deyən səfir vurğulayıb ki, ABŞ belə layihələrə daim dəstək verməyə hazırdır.

Təhsil Nazirliyinin şöbə müdiri Tural Əhmədov bildirib ki, Corc Vaşinqton Universiteti ilə ikili diplom proqramı ADPU-nun bu sahədəki uğurlarını əks etdirir.

## Riyaziyyat fakültəsinin YAP Gənclər Birliyi "Pifaqor" adlı tədbir keçirib

Martın 15-də ADPU-nun Yeni Azərbaycan Partiyası Gənclər Birliyinin (ADPU YAP GB) Riyaziyyat fakültə təşkilatının təşəbbüsü ilə Riyaziyyat gününə həsr olunmuş "Pifaqor" adlı onlayn tədbir keçirib. Tədbirdə ADPU-nun rektoru professor Cəfər Cəfərov, porektorlar dosent Eldar Aslanov, Tural Cəlilov, rektorun müşaviri Ümid Mehdiyev, Tədris departamentinin direktoru dosent Sənan Əliyev və fakültə dekanları iştirak ediblər.

Prof. C.Cəfərov öz nitqində bu cür tədbirlərin tələbələrin elmə həvəsini artırmaq, dünyagörüşünü genişləndirmək yolunda mühüm olduğunu qeyd edib. O, dövlətimizin Ali Baş Komandanın rəhbərliyi ilə Vətən müharibəsində misilsiz qalibiyyət qazanmasının əsas səbəbi kimi xalqımızın qəhrəmanlığı, dövlət rəhbərinin qətiyyətli və mükəmməl siyasəti ilə yanaşı, döyüşlərdə elmin və texniki nəaliyyətlərinin tətbiqinin də əhəmiyyətini qeyd edib. Prof. C.Cəfərov bu baxımdan gənclərin əzmlə elmə yiyələnmələrinin vacibliyini vurğulayıb. O, son 30 ildə ölkəmizin inkişafında YAP-ın böyük rol oynadığını bildirib.

Riyaziyyat fakültəsinin dekanı dosent Araz Fərəcov riyaziyyatın həyatımızdakı rolundan danışıb. O son illər elmin inkişafında YAP-ın xüsusi rolunu vurğulayıb.

Sonra tələbələr arasında iki hissədən ibarət maraqlı riyazi viktorina keçirilib. Viktorinada ADPU-nun bütün fakültələrindən tələbələr iştirak edib.



## ADPU əməkdaşları ERASMUS+ üzrə beynəlxalq seminarda iştirak ediblər

Mart ayının 10-11-də Niderlandın Vitenborq Universitetinin koordinatoru olduğu "Azərbaycan və Rusiya ali təhsil müəssisələrində təlim, tədris və qiymətləndirmədə təhsilin daxili keyfiyyət təminatının inkişaf etdirilməsi" layihəsi çərçivəsində iki günlük seminar keçirilib. Təlimdə Avropanın Niderland, İspaniya və Almaniya kimi ölkələrinin universitetləri ilə yanaşı, Rusiyanın 4 universitetinin, eləcə də ölkəmizdən ADPU və NDU-nun nümayəndələri iştirak edib. Seminarda ADPU üç nəfər əməkdaşla - Keyfiyyət təminatı şöbəsinin müdiri Qalib Şərifov, Təlim-tədris mərkəzinin müdiri Günay Məhərrəmova və Beynəlxalq əlaqələr şöbəsinin əməkdaşı Nurəngiz Mahmudova ilə təmsil olunub. Q.Şərifov Azərbaycanda keyfiyyət təminatı sahəsində qanunvericilik aktları, G.Məhərrəmova isə ADPU-da monitorinq və qiymətləndirmə barədə təqdimatla çıxış ediblər.

Təlim layihənin növbəti mərhələsində işçi paketləri üzrə görüləcək işlərin icrası və tərəfdaşlar arasında bölünməsi ilə yekunlaşıb.



## "ADPU TV" onlayn "YouTube" televiziyası fəaliyyətə başlayıb

ADPU ictimaiyyətlə əlaqələrini daha da inkişaf etdirmək məqsədilə ADPU Sosial Media Marketinq komandası (ADPU SMM) 2020-ci ilin oktyabrından universitetin rəsmi sosial media hesablarını yenidən quraraq "Instagram" və "Twitter"də vahid rəsmi səhifələr yaradıb, ilk dəfə universitetin rəsmi teleqram kanalını istifadəyə verib. Beş aydan az müddətdə fərqli konseptdə və operativ fəaliyyət göstərən səhifələr tələbələr arasında böyük auditoriya toplayıb və tələbələr arasında minlərlə izləyici kütləsi cəlb edərək oxşar səhifələr arasında öz fərqini ortaya qoya bilib.



Hazırda komanda ADPU-nun 100 illiyi ilə bağlı bu istiqamətdə fəaliyyətini genişləndirərək "YouTube" platformasında universitetin "ADPU TV" adlı onlayn televiziyasını istifadəyə verib. Artıq davamlı fəaliyyətə başlayan layihənin fərqli cəhətləri sırasına kanalda təhsil mütəxəssisləri, təhsilverənlər, tanınmış alimlərlə müsahibələrin, canlı yayımların, müxtəlif səpkidə verilişlərin, rubrikaların hazırlanması, tələbə fəaliyyətlərinin işıqlandırılması aiddir. Kanalın yayım və texniki heyəti könüllü tələbələrdən ibarət ibarətdir. Onlayn televiziya "Təhsil Saatı" verilişinin ilk buraxılışını və "ADPU Tanıtım Filmi"ni hazırlayaraq yayımlayıb.

*Əziz oxucular!*
*QR kodu smartfonunuzda oxudaraq "ADPU TV"-nin bir-birindən maraqlı verilişləri və filmlərini izləyə bilərsiniz.*



## Professor Mahirə Nağıqızının kitabları Quba təhsil ocaqlarına hədiyyə edilib



Mart 30-da ADPU-nun Filologiya fakültəsinin dekanı, çağdaş Azərbaycan ədəbiyyatının görkəmli nümayəndəsi, şairə, professor Mahirə Hüseynova (Nağıqızı) ADPU-nun Quba filialının kitabxanasına müxtəlif adda qiymətli kitablar hədiyyə edib. Hədiyyə edilən kitablardan "Salam olsun" və "Dilimiz - varlığımızdır" adlı elmi-publisistik toplu istəklər səbəbilə filialın direktoru dosent Yusif Alıyevin təşəbbüsü ilə Quba rayonu üzrə bir neçə təhsil ocağına, kitabxanalara hədiyyə edilib. Qeyd edək ki, bu yaxınlarda çap olunan "Salam olsun" kitabı şairənin bu son aylarda əsasən Vətən müharibəsinə həsr etdiyi hərbi-vətənpərvərlik ruhlu əsərlərinin yer aldığı olduqca dəyərli nəşrdir.

## ADPU-da "Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr" şöbəsi yaradılıb




ADPU-nun mart ayının 5-də keçirilən Elmi Şurasının qərarlarına uyğun olaraq universitetdə müəyyən struktur təkmilləşdirmələri aparılıb. Rektor, professor Cəfər Cəfərovun martın 16-da imzaladığı əmrlə universitetin "İctimaiyyətlə əlaqələr və marketinq" şöbəsi və "Tədbirlərin təşkili və tələbələrlə iş" şöbəsinin bazasında yeni şöbə - "Tələbələrlə iş və ictimaiyyətlə əlaqələr" şöbəsi yaradılıb və yeni şöbənin əsasnamə və strukturu təsdiq olunub. Yeni şöbənin yaradılması optimallaşdırma, tələbələrlə iş və ictimaiyyətlə əlaqələrin qurulmasında çevikliyin təmin edilməsi məqsədi daşıyır.

Əmrə əsasən yeni şöbədə ADPU-nun 2020-ci il məzunlarından iki nəfər gənc də işə qəbul edilib. Bu ənənə ADPU-da bir neçə ildir davam edir və ali təhsil ocağı son illərdə universitetdən məzun olan onlarla bacarıqlı məzununu işə götürüb. Ümumən ADPU öz məzunlarının işlə təmin olunmasını diqqətdə saxlayır.

Yeni şöbəyə indiyə qədər "Tədbirlərin təşkili və tələbələrlə iş" şöbəsinin müdiri olmuş Kərimli Turan Abulxalıq oğlu müdir, yeni təsis edilən "mətbuat katibi" ştatına isə gənc mütəxəssis Hüseynov Cavid Niyazi oğlu təyin edilib. O cümlədən yeni işə götürülən universitetin məzunları - Mirzəyev Taleh Əlizamin oğlu redaktor, Vahidov Elvin Eldəniz oğlu isə mütəxəssis vəzifələrinə təyin ediliblər.

## Təhsil İnstitutunun direktoru ADPU-da olub

Martın 30-da ADPU-da Təhsil İnstitutunun direktoru Rüfət Əzizovla görüş keçirilib. ADPU-nun rektoru prof. Cəfər Cəfərov Təhsil İnstitutu ilə uzun müddətdir davam edən elmi-pedaqoji əməkdaşlıqdan və ortaq layihələrin icrasından söz açıb, hazırda da STEAM, inklüziv təhsil sahəsində tədris modullarının və təlim-metodik vəsaitlərin hazırlanması sahəsində əməkdaşlığı yüksək qiymətləndirib.



Rüfət Əzizov ADPU-nun ölkəmizdə təhsilin məzmunu və metodikasının hazırlanması və müasir təhsil islahatlarında önəmli elmi-metodik mərkəz olduğunu və müəllim hazırlığının bayraqdarı kimi öz fəaliyyətində müasir pedaqoji araşdırmaları tətbiq etdiyini vurğulayıb. O, ADPU ilə çoxşaxəli elmi-pedaqoji əməkdaşlığın verəcəyi faydalara toxunub. ADPU-nun prorektorlarından prof. Asəf Zamanov, dos. Eldar Aslanov bakalavriat səviyyəsində tədrisin təşkili metodları, müvafiq sahələr üzrə tədris modullarının tətbiqi, magistratura və doktorantura səviyyəsində yüksəkixtisaslı pedaqoji kadrların, metodistlərin hazırlanması ilə bağlı fikirlərini bölüşüblər.

Görüşdə ümumilikdə ADPU və Təhsil İnstitutu arasında əlaqələrin mövcud vəziyyəti və perspektivləri müzakirə olunub.

## "Ekstremal şərait və onun yaratdığı sosial-psixoloji problemlər" mövzusunda növbəti seminar

Martın 18-də ADPU-nun Məktəbəqədər təhsil fakültəsinin təşkilatçılığı ilə "Ekstremal şərait və onun yaratdığı sosial-psixoloji problemlər" mövzusunda növbəti seminar təşkil edilib. Budəfəki seminar universitetin və struktur qurumların rəhbərliyi və əməkdaşları üçün keçirilib. Seminarda universitetin rektoru professor Cəfər Cəfərov, müvafiq struktur rəhbərləri, fakültə dekanları və digər strukturların nümayəndələri, müəllimlər iştirak edib.

Prof. C.Cəfərov seminarın önəmli bir problemə həsr olunduğunu qeyd edərək bu sahədə görüləcək işlərin müntəzəmliyinin yetişən müəllim kadrlarının sağlam tərbiyəsinə əlavə fayda verdiyini söyləyib.

Seminarın moderatoru, Məktəbəqədər təhsil fakültəsinin dekanı prof. Şəhla Əliyeva pandemiya şəraitində cəmiyyətdə formalaşan depressiv vəziyyətdən və artan sosial-psixoloji gərginliklərdən, mövcud vəziyyəti müəyyən qədər aradan qaldırmaq üçün aranan yollardan danışıb və müzakirə olunacaq istiqamətləri elan edib.

Prof. Ramiz Əliyev "Ekstremal şəraitdə psixika və davranışda baş verən dəyişikliklər", dos. Məhərrəm Əliyev isə "İntiharın yeddili preventiv modeli" mövzusunda məruzələr edib. Müəllimlərdən Yaqut Ağasiyeva isə "Pandemiyanın gənclərə psixoloji təsiri" mövzusunda çıxış edib. Fakültənin alimlərindən prof. Elmar Hüseynov, dos. Pərişan Həsənova və dos. Şərafət Baxışova da mövzu ətrafında maraqlı maraqlı fikirlər səsləndirib.



## RİMM-də Nəsrəddin Tusi onlayn seminarı



Martın 15-də Bakıda Rusiya İnformasiya və Mədəniyyət Mərkəzində (RİMM) dahi Azərbaycan alim-filosofu Şeyx Nəsrəddin Tusinin anadan olmasının 820 illiyinə həsr olunan onlayn seminar keçirilib.

Seminara Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU), Bakı Dövlət Universiteti (BDU) və Bakı Slavyan Universitetinin (BSU) tələbələri, müxtəlif ali və orta məktəb müəllimlərindən 80 nəfərə yaxın iştirakçı qatılıb. RİMM-in əməkdaşı Lubov Yakuninanın moderatorluğu ilə "Zoom" platformasında baş tutan tədbirdə bu yaxınlarda ADPU və RİMM arasında keçirilən əməkdaşlığa dair görüş çərçivəsində ADPU-nun alimləri Nəsrəddin Tusi irsinə aid seminar keçiriblər. Mühazirəçi qismində çıxış edən ADPU-nun Sosial və humanitar məsələlər üzrə prorektoru professor Fikrət Rzayev, ADPU-nun professoru, f.ü.e.d. Leyla Vəzirova və ADPU-nun İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının müdiri, p.ü.e.n., dosent Yaqut Rzayeva çıxışlarında böyük mütəfəkkirin dünya və Azərbaycan elmi-fəlsəfi irsindəki rolundan geniş söz açıblar. Qeyd edilib ki, ADPU da vaxtilə N.Tusinin adını daşıyıb.

# ADPU-nun məşhur məzunları

Əziz oxucularımız! "Gənc Müəllim" qəzeti olaraq 100 ilin möhtəşəm elm və təhsil ocağı – Pedaqoji Universitetin məşhur məzunlarını sizlərə tanıtmaqda davam edirik. Bu sayımızda da ölkəmizin və dünyanın elmi-mədəni mühitinə ziya saçmış növbəti 5 məzunumuzu sizə təqdim edirik.

## Həsən Mirzə



**Həsən İbrahim oğlu Mirzəyev** – filologiya elmləri doktoru, professor, dilçi-türkoloq, Azərbaycan Respublikasının Əməkdar Elm Xadimi (2007), Azərbaycan Aşıqlar Birliyinin üzvü (2008-2015). Azərbaycan Respublikası Milli Məclisinin I çağırış deputatı seçilmişdir. Həsən Mirzəyev 2002-ci ildə Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin fərmanı ilə "Şöhrət" ordeni ilə təltif edilib.

H.Mirzəyev 1927-ci il noyabr ayının 26-da Dərələyəzin Qovuşuq kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra o, 1948-1950-ci illərdə Naxçıvan Dövlət Müəllimlər İnstitutunda, 1951-1955-ci illərdə Azərbaycan Dövlət Pedaqoji İnstitutunda (indiki ADPU) ali təhsil alıb. 1955-ci ildə o, ali təhsilini başa vurduqdan sonra rayon xalq maarif şöbəsinin inspektoru və Qovuşuq kənd orta məktəbinin müəllimi və məktəb direktoru işləyib. H.Mirzəyev 1959-1962-ci illərdə ADPU-nun aspiranturasını bitirdikdən sonra ömrünün sonunadək həmin institutda çalışıb. O, müxtəlif illərdə müəllim, baş müəllim, dosent, professor, kafedra müdiri və dekan vəzifələrini tutub.

H.Mirzəyev 1965-ci ildə namizədlik, 1988-ci ildə doktorluq dissertasiyalarını müdafiə edib və 1990-cı ildə professor elmi adını alıb.

Azərbaycan filologiya elminin inkişafında H. Mirzəyevin özünəməxsus yeri var. O, dilçiliyin müxtəlif problemlərinə dair bir sıra sanballı tədqiqatları ilə tanınır. Alimin xüsusən Qərbi Azərbaycanın yer adları ilə bağlı araşdırmaları milli tarixin öyrənilməsi baxımından xüsusi əhəmiyyət kəsb edir. H. Mirzəyevin 200-dən çox elmi əsəri, o cümlədən 25 kitabı və 10-a yaxın dərs vəsaiti işıq üzü görüb. Bunlardan "Azərbaycan dilində sadə feillər" (1984, K. A. Məmmədova ilə birlikdə), "Hanı o səndəki el, Dərələyəz" (2007) kimi kitablarını misal göstərmək olar. 25 fevral 2015-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## Budaq Əbdüləli oğlu Budaqov



**Akademik Budaq Əbdüləli oğlu Budaqov** 1928-ci il fevralın 23-də Ermənistan SSR-in Zəngibasar rayonunun Çobankərə kəndində dünyaya göz açıb. 1945-1947-ci illərdə İrəvanda Azərbaycan pedaqoji məktəbində, 1947-1951-ci illərdə isə ADPU-nun coğrafiya fakültəsində ali təhsil alıb. O, 1951-1955-ci illərdə Moskvada SSRİ Elmlər Akademiyasının (EA) Coğrafiya İnstitutunun (Cİ) aspiranturasında oxuyub. "Şöhrət" ordeni laureatıdır.

B.Budaqov Azərbaycan SSR EA Cİ-də kiçik və böyük elmi işçi, şöbə müdiri, elmi işlər üzrə direktor müavini işləyib, 1994-cü ildən ömrünün sonuna qədər Azərbaycan Milli Elmlər Akademiyasının (AMEA) Həsən Əliyev adına Coğrafiya İnstitutunun direktoru olub. 1969-cu ildə professor elmi dərəcəsini alıb. O, 1976-cı ildə EA-nın müxbir üzvü, 1989-cu ildə isə həqiqi üzvü seçilib.

Görkəmli alim respublikamızda coğrafiya elminin inkişafına qiymətli töhfələr verib. Onun tədqiqatlarının başlıca istiqamətlərini geomorfologiya, landşaftşünaslıq, paleocoğrafiya və toponimika məsələləri təşkil edib. Alimin rəhbərliyi və yaxından iştirakı ilə respublikada səhralaşma proseslərinin elmi əsasları araşdırılıb, landşaftın geokimyasına dair problemlər tədqiq olunub. B.Budaqov coğrafi təkanın, sel ocaqlarının təsnifatını vermiş, təbiətin dağıdıcı hadisələrini sistemləşdirmiş, Böyük Qafqazın Azərbaycan hissəsinin geomorfologiyasını, yeni tektonik hərəkətlərini, qədim buzlaşmasını öyrənmiş, ərazinin xəritələrini tərtib etmişdir. İlk dəfə (1956) Qafqazda 3600 metr mütləq yüksəklikdə Üst Sarmat yaşlı dəniz faunasını aşkara çıxarmışdır. Azərbaycanın təbii və antropogen landşaftını, orada baş verən səhralaşmanı, landşafın geokimyasını öyrənmişdir. İlk dəfə Azərbaycanda təbii-dağıdıcı hadisələrin intensivliyinə görə ekoloji-coğrafi şəraiti tədqiq etmiş və ərazinin 1:500000 xəritəsini tərtib etmişdir.

B.Budaqov Cənubi və Qərbi Azərbaycanda, Gürcüstan və Mərkəzi Asiyada olan türk mənşəli toponimləri işləyərək geniş oxucu kütləsinə çatdırıb. 2012-ci ilin noyabrın 1-də 84 yaşında vəfat edib.

## Zahid İsmayıl oğlu Xəlilov



**Akademik Zahid İsmayıl oğlu Xəlilov** – Sovet və Azərbaycan SSR dövlət xadimi, akademik, görkəmli riyaziyyatçı-alim, 1962-1967-ci illərdə Azərbaycan SSR Elmlər Akademiyasının Prezidenti olmuşdur.

Zahid Xəlilov 14 yanvar 1911-ci ildə Tiflis quberniyasının Ekatrinenfeld nahiyəsinin (indiki Bolnisi rayonu) Saraçlı kəndində anadan olmuşdur.

Türk Pedoqoji Texnikumunu Tiflisdə bitirdikdən sonra 1929-cu ildə Azərbaycan Dövlət Universitetinin riyaziyyat şöbəsinə daxil olmuş, 1930-1934-cü illərdə Universitet bağlandığına görə ali təhsilini Azərbaycan Pedaqoji İnstitutunda başa vuraraq Tiflisdə Dəmir yolu Nəqliyyatı Mühəndisləri İnstitutunda işləmişdir. 1940-cı ildən isə ömrünü həmişəlik Azərbaycan və onun elmi ilə bağlamışdır.

1942-ci ildən SSRİ EA-nın Azərbaycan filialına keçmiş, 1945-ci ildə Azərbaycan EA yarandıqda isə onu fizika və riyaziyyat sektorlarının rəhbəri təyin etmişlər. Z.Xəlilov 1946-cı ildə 35 yaşında Azərbaycanın ilk fizika-riyaziyyat elmləri doktoru olmuşdur. Zahid müəllim nəinki Azərbaycan funksional analiz məktəbinin banisi, həm də SSRİ-də bu sahənin ideoloqlarından olmuş, SSRİ-də ilk "Funksional analiz" dərsliyini yazmışdır (1949).

Z.Xəlilov 1955-ci ildə Azərbaycan EA-nın həqiqi üzvü seçilmiş, 1957-1959-cu illərdə Akademiyanın vitse-prezidenti, 1962-1967-ci illərdə isə prezidenti olmuşdur. 1967-ci ildən ömrünün sonuna qədər özünün yaratdığı Riyaziyyat və Mexanika İnstituna rəhbərlik etmişdir. 1974-cü il fevral ayının 4-də vəfat etmişdir. Məzarı Fəxri xiyabandadır. Bakı şəhərində adına küçə və məktəb var.

## Salahəddin Həsən oğlu Kazımov



**Salahəddin Həsən oğlu Kazımov – Sovet İttifaqı Qəhrəmanı,** 1920-ci ilin dekabr ayının 22-də Zaqatala şəhərində dünyaya göz açmış və 1941-ci ildə hərbi xidmətə çağırılmışdır. 1942-ci ilin aprelindən Mərkəzi cəbhədə 13-cü ordu tərkibində, 62-ci artilleriya alayında batalyon komandiri vəzifəsində döyüş əməliyyatında başlamışdır.

Baş leytenant Salahəddin Kazımov Desna, Dnepr və Pripyat çaylarının keçilməsi əməliyyatlarında fərqlənmişdir.

1943-cü ilin 22-23 sentyabrında Dnepr çayını keçərkən sərrast atəş ilə düşmənin atəş nöqtələrini məhv edərək alayın Dneprin sağ sahilinə keçməsini və hücüm əməliyyatının Çerniqov və Qomel istiqamətlərində genişlənməsini təmin etmiş və 1943-cü ilin 16 oktyabrında Sovet İttifaqı Qəhrəmanı adı almışdır.

Müharibədən sonrakı dövrdə Azərbaycanda Daxili İşlər Nazirliyi sistemində işləmiş və general-mayor rütbəsində nazir müavini vəzifəsinə qədər yüksəlmişdir. 2 iyul 1978-ci ildə 57 yaşında dünyasını dəyişmişdir. Fəxri Xiyabanda dəfn edilib.

Sovet İttifaqı Qəhrəmanı Salahəddin Kazımovun Bakı şəhərində yaşadığı Səməd Vurğun küçəsi, 196 ünvanındakı binaya barəlyefi vurulmuşdur.

## Mirələkbər İbrahimov



**Mirələkbər İbrahimov – Azərbaycanın Milli Qəhrəmanı; Qarabağ müharibəsi şəhidi.** 30 sentyabr 1961-ci ildə Qərbi Azərbaycanın Vedibasar mahalının Xalisa kəndində doğulmuşdur. Birinci sinfə burada getmiş, sonra Bakı şəhərinə köçmüşlər. 1978-ci ildə Bakı şəhərindəki 158 saylı orta məktəbi bitirmişdir və hərbi xidmətə getmişdir. Daha sonra ADPU-nun İncəsənət və fiziki tərbiyə fakültəsində təhsil almışdır. Bakıda 153 saylı orta məktəbdə ibtidai hərbi hazırlıq müəllimi işləyib.

Qarabağda döyüşlər başalananda könüllü olaraq cəbhəyə göndərilməsini xahiş edir. 1993-cü ildə onu yenicə yaradılmış Yasamal taboruna komandir təyin edirlər. Mirələkbər öz taboru ilə Füzuli rayonunun Kürdmahmudlu, Aşağı Seyidəhmədli kəndləri uğrunda gedən döyüşlərdə vuruşur. Onun son döyüşü 5 mart 1994-cü ildə olur. Mənfur erməni quldurları iki kəndi işğal etmişdilər. Əks-hücuma keçən cəsur komandirin taboru kəndləri azad edir. Bu döyüşdə mənfur ermənilərin gülləsinə tuş gələn Mirələkbər qəhrəmancasına şəhid olur. İbrahimov Mirələkbər Mirələsgər oğlu ölümündən sonra "Azərbaycanın Milli Qəhrəmanı" adına layiq görülmüşdür (1994). Bakıda, Şəhidlər xiyabanında dəfn edilib. Dərs dediyi 153 saylı orta məktəb adını daşıyır.

# Tanınmış rəssam Rafiq Əzizin ADPU ilə bağlı xatirələri

*Bir zamanlar təhsil aldığım, hazırda çalışdığım Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) 100 illiyinin tamam olduğu ərəfədə tanınmış rəssam, ADPU-nun məzunu, 20 ilə yaxındır qardaş Türkiyədə yaşayıb-yaradan Azərbaycanın əməkdar incəsənət xadimi Rafiq Əzizin ən böyük əsərlərindən biri olan "1071 Malazgirt meydan müharibəsi" əsərinin bu ilin fevral ayının 26-da doğum günü münasibətilə Türkiyə Cümhuriyyətinin Prezidenti Cənab Rəcəb Tayyib Ərdoğana hədiyyə edilməsi mədəniyyətimiz üçün böyük hadisə idi.*



*1992-ci ildə Xocalı soyqırımından sonra Rafiq Əzizin Xocalıda valideynlərini itirən uşaqları Türkiyəyə gətirərək onların təhsili və sağlamlığının təmin olunması yönündəki fəaliyyətləri rəssamın Türkiyəyə köçməsi və qardaş ölkədə yaşayıb-çalışması ilə sonuclandı. O, ötən müddət ərzində qardaş ölkənin mədəni həyatında böyük xidmətlər göstərdi. Bizim məqsədimiz də ADPU-nun məzunu olan Rafiq Əzizin təhsil fəaliyyəti və uğurlarının bir örnək kimi gənclərimizə çatdırmaqdır. Təqdim olunan yazının gənclərin peşəyönümü tərbiyəsində önəmli olacağını düşünürük.*

**Rafiq Əzizin söhbətini təqdim edirik:**

**ADPU-ya qədər**

- Birinci sinifə gedəndə təsadüfən çəkic və kəlbətinin surətini rəsm dəftərimə çəkəndə ibdidai sinif müəllimim Məcid müəllim rəssamlıq qabiliyyətimi kəşf etdi.
- Əzim Əzimzadə adına Rəssamlıq Məktəbinə daxil olmaq üçün bir ay ... Susana Qlebovna adlı yaşlı bir rus rəsm müəlliminin dərnəyinə getdim, uzun vaxt yemək görməyən ac insanlar kimi sulu boya ilə natürmort çəkməyi öyrəndim.
- Məktəbin təmirdə olması, sinifimizin olmaması və rusca bilmədiyim üçün könüllü olaraq hərbi xidmətə getdim. 1974-cü ildə doğma rəssamlıq məktəbinə dönəndə artıq professional tərtibatçı rəssam idim.
- Rəssamlıq məktəbinə oxuyarkən məni Hökumət Evində bədii tərtibatçı kimi yarımştat işə götürdülər.
- Bir il müəllim işlədiyim Ağdaş rayonununun həm də bədii tərtibatı ilə məşğul oldum.

**Azərbaycan Dövlət Pedaqoji Universiteti**

Mən 1977/1978-ci dərs ilində bir il Ağdaşda Nizami adına 2 nömrəli şəhər məktəbində rəsm-rəsmxətt müəllimi işlədim. Qısa müddətdə uşaqlara rəsmi və rəsmxətti sevdirdim. Eləcə də rayonun bədii tərtibat işlərini gördüm. Bir il sonra, 1978-ci ildə ali təhsil almaq üçün sənədlərimi o zaman V.İ.Leninin adını daşıyan Azərbaycan Pedaqoji İnstitutuna (indiki ADPU – red.) verdim. İlk dəfə eksperimentlə, hər iki qəbul imtahanından "əla" qiymət alaraq instituta qəbul oldum. Ağdaşa əmək kitabçamı almaq və işdən azad olmaq üçün gedəndə məni işdən azad etmək istəmədilər. Sonra sənədlərimi hazırlayıb məni təəssüflə yenidən Bakıya yola saldılar. İnstituta qəbul imtahanlarında eksperimentlə daxil olmağım kafedra müdiri dosent Paşa Hacıyevin diqqətini çəkdi. O dedi ki, sən hazırlıqlı müəllimsən, artıq bizim ali məktəbdə həm tələbə, həm də mənim tələbə assistentim olacaqsan. Mənim institutda müəllimim Məhəmməd Əmin Rəsulzadənin nəvəsi Rais Rəsulzadə olub. O çox intizamlı, bacarıqlı, təvazökar müəllim idi. Sinifdə sıra ilə tələbələrə çəkdikləri işlə əlaqəli göstəriş verərkən sıra mənə çatanda gülərək deyirdi: *"Afərin, sənə nə deyim ki, sən özün bunları bilirsən."* Bundan sonra yenə də öz iradlarını deyərdi. Mən onu bir müəllim və insan olaraq çox sevirdim.



НИЈЈӘТИН ҺАРА, МӘНЗИЛИН ДӘ ОРА...

8·IX 1978. «Мүәллим»

Јалман Којчај рајонунун ән сәфалы вә мәнзәрәли кәндләриндән бириндир. Кәнддән бир аз аралы илан кими гыврыла-гыврыла ахан чај онун көзәллијини даһа да артырыр. Мәним ушаглыг илләрим һәмин кәнддә, һәмин чајын кәнарында кечмишдир. Бу фүсункар мәнзәрәјә бөјүк марагла бахмагдан һәзз алырдым. Бәлкә мәним кичик гәлбимдә рәссамлыг сәнәтинә олан мараг да һәмин вахтлар баш галдырмышды. Тәсадүфи дејил ки, һәлә орта мәктәбдә охујаркән кәндимизин бу фүсункар мәнзәрәсини дәфәләрлә кағыза көчүрмүшдүм.

Рәсмдән дәрс дејән Мустафа мүәллим бу сәнәтә олан марағымы нәзәрә алараг мәнимлә мүнтәзәм мәшғул олмаға башлады. Чәкдијим рәсмләри бир гајда олараг әввәлчә Мустафа мүәллимә көстәрирдим. О исә рәсмләримин чатышмајан ҹәһәтләрини гејд едир вә мәни рәсмләр үзәриндә јенидән ишләмәјә руһландырырды.

Орта мәктәби битирәндә кәләчәк сәнәтими дә мүәјјәнләшдирмишдим. Сәнәдләрими Әзим Әзимзадә адына Азәрбајҹан Дөвләт Рәссамлыг Мәктәбинин рәсм вә рәсмхәт шө'бәсинә вердим. Биринчи курса гәбул олундум. Сонра орду сыраларына чағырылдым. Әскәрлик һәјаты мәним үчүн әсил мәктәб олду. Бурада кәләчәк рәсмләрим үчүн јени мөвзулар топладым.

Јенә тәһсил илләри... Рәссамлыг мәктәбини битирдикдән сонра Ағдаш рајонунда мүәллим ишләдим. Сон дәрәҹә севдијим бу көзәл сәнәти шакирдләримә һәвәслә өјрәдирдим.

Лакин али тәһсил алмаг фикри мәни бир ан раһат бурахмырды. Одур ки, өз севимли пешәми давам етдирмәк вә бу саһәдә али тәһсил алмаг арзусу мәни В. И. Ленин адына АПИ-јә кәтирди.

Бир чох абитуријент кими мән дә експеримент јолу илә института дахил олдум. Илк ики имтаһандан «ә'ла» гијмәт алдым. Үмуми техники фәнләр факултәсинин рәсм, рәсмхәт вә әмәк шө'бәсинин биринчи курсуна гәбул олундум.

Мәним үчүн тәләбәлик илләри јенидән башланды. Илк күндән һисс едирәм ки, институтда тәләбәләр үчүн көзәл шәраит јарадылмышдыр.

Кәнҹләрә көстәрилән бу аталыг гајғысы үчүн доғма партијамыза үрәкдән миннәтдарам!

Рафиг ӘЗИЗОВ,
үмуми техники фәнләр факултәси рәсм, рәсмхәт вә әмәк шө'бәсинин I курс тәләбәси.

***Rafiq Əzizin 08 sentyabr 1978-ci ildə "Gənc Müəllim" qəzetində dərc olunan yazısı***

APİ-də mənim müvəffəqiyyətli təhsilim və peşəkar bədii tərtibatçı rəssam olmağım qısa müddətdə aşkar edildi. O zamanlar İnstitut Partiya Komitəsinin katibi Xəlil Xəlilov daim məni çağırır, institutun bədii tərtibat işlərində yardım etməmi istəyirdi. Doğrusu, Əzim Əzimzadə adına Rəssamlıq Məktəbini müvəffəqiyyətlə bitirməyim və bəzi təcrübi dərsləri orada da keçdiyimdən institutdakı dərslər mənə çox asan gəlirdi. Heç çətinlik çəkmədən boş vaxtlarımda daim doğma institutumuzun bədii tərtibatını və s. ictimai işləri həvəslə işləyirdim. Mənim təhsil aldığım illərdə fəaliyyətim institut rektorluğunun daim diqqət mərkəzində idi. Mən tələbə ikən professor Arif Quliyevin rəhbərliyi ilə institut nəzdində Tələbə Konstruktor Bürosu yaratdım. O büro həmin vaxt Azərbaycan Dərin Neft və Qaz Yataqları İnstitutunun direktoru akademik Midhət Abbasovun sifarişlərini yerinə yetitirdi. Mənim başçılığımla bu büroda tələbələr Dərin Neft və Qaz Yataqları İnstitutu üçün çertyojlar çəkirdilər. Özünü maliyyələşdirən bu büro o illərdə institut üçün xeyli maddi vəsait qazandırmışdı.

İnstitutda aktiv fəaliyyətim və təhsilimdə əlaçı olmağım diqqətə alınaraq rektorluq tərəfindən mən Lenin təqaüdünə namizəd göstərildim. Lenin təqaüdü verilən gün məni rektorluğa çağırıb dedilər ki, rektoron qapısı önündə gözlə, içəridə iclasda sıra sənin Lenin təqaüdünə gələndə içəri çağırılacaqsan. Sonra hamı rektorun otağına girdi. Saat 18:00-da başlayan iclas bitmək bilmədi, arada koridora çıxıb gəzişirdim. Lakin gecə saat 02:00 radələrində birdən mənə elə gəldi ki, bəlkə iclas bitib, adamlar otaqdan çıxıb gedib, neçə dəfə qulağımı qapıya dayadım, görüm içəridən səs gəlirmi? Səs eşitmədim, qapını açmaq istədim, ancaq aça bilmədim. Mənə elə gəldi ki, qapı bağlanıb. 02:30 radələrində institutun qaranlıq koridorunda məni kabus basdı, mənə elə gəldi ki, çoxdan iclas qurtarıb, mən burada boşuna gözləyirəm. Eləcə mən o gün o fürsəti qaçırtdım, ***gecə saat 03:00 radələrində evə gəldim. Səhər instituta gələndə qaravulçu mənə dedi ki, gecə sən gedəndən beş dəqiqə sonra rektor otağından çıxıb səni soruşdu, dedim, indi getdi. Beləcə mən Lenin təqaüdü almaq fürsətini itirdim. Sonra bir daha bu mövzuya dönmədilər.***

İnstitutu Qırmızı Diplomla bitirdim. Aktiv tələbəliyimi, təhsilimi və təcrübəmi nəzərə alaraq təyinatımı "Estetik silsilə dərsləri" üzrə metodist olaraq birbaşa Maarif Nazirliyinə verdilər.

**Qeyd: Rəssamın sonrakı fəaliyyəti 90-cı illərdən Xocalı faciəsinin tanıdılması və şəhid övladlarına dəstək məqsədi ilə Türkiyə ilə bağlı olur və hazırda da orada yaşayıb yaradır.**



**Tarixin güzgüsündə Rafiq Əziz:**

***Əzizov Rafiq Novruz oğlu***

*01 noyabr 1953, Göyçay, Azərbaycan doğumlu*
*1971-1977 – Əzim Əzimzadə adına Rəssamlıq Məktəbi (Bakı ş.)*
*1972-1974 – Həqiqi hərbi xidmət*
*1977-1978 – Ağdaş rayonu, 2 nömrəli orta məktəb. Müəllim*
*1978-1983 - V.İ.Lenin adına ADPİ, fərqlənmə ilə (Bakı ş.)*
*1983-1989 - AR Maarif Nazirliyi, metodist*
*1984-1988 - ADETPİ, aspirant*
*1989-1991 - ADETPİ, elmi işçi*
*1991-1992 - Azərbaycan İstedad Assosiasiyası, məsul katib*
*1992-ci ildən Azərbaycan Rəssamlar İttifaqı, Uşaq Qiyabi Xalq Universiteti, rektor.*
*1992 - Birinci Qarabağ müharibəsində (Xocalıda) valideynləri şəhid olan 10 uşağı öz hesabına İstanbul İstək Vəqfinə təhsil üçün aparıb.*
*1994-1996 – İstanbul İstək Vəqfı Başkanının Mədəniyyət və İncəsənət müşaviri*
*1996- ci ildən indiyədək Yeddtəpə Universitetində müəllim, professor (İstanbul ş. Türkiyə Cümhuriyyəti)*
*1994 – Elmlər doktoru (İstanbul Marmara Universiteti)*
*2017 - Professor elmi adı (AR Prezidenti yanında Ali Attestasiya Komissiyası)*
*2005 - Azərbaycan Rəssamlar İttifaqının üzvü*
*2005 - UNESCO İncəsənət Assosiasiyasının üzvü (I.A.A. UNESCO)*
*2014 - Azərbaycanın əməkdar incəsənət xadimi*
*Türkiyə Cümhuriyyəti Zərbxanası tərəfindən buraxılan 8 yubiley pulunun dizaynının müəllifi*
*19 fərdi sərgi (müxtəlif ölkələrdə)*
*160-dan çox qrup sərgisi (müxtəlif ölkələrdə)*

***Yazı ilə geniş şəkildə tanış olmaq üçün QR kodu smartfonunuzda oxudun.***



***Söhbəti qələmə aldı: dosent Ənvər İmanov***
***Azərbaycan Dövlət Pedaqoji Universiteti, Tədris Departamenti***
***Direktor müavini***

# İctimai həyat - tələbə təşkilatlarının fəaliyyəti

## ADPU THİK tələbələrə adlı təqaüd və internet paket dəstəyi verməkdə davam edir




ADPU-nun Tələbə Həmkarlar İttifaqı Komitəsi (THİK) Pandemiya dövründə onlayn dərslərə qoşulmaqla bağlı maddi çətinlikləri olan növbəti 70 tələbəmizə bir aylıq internet paketi ilə dəstək olub. Növbəti aylarda da bu yardımlar davam edəcək.

Həmçinin mart ayının sonunda 2020-2021-ci tədris ilinin payız sessiyasının nəticələrinə və ictimai işlərdə fəallığına görə seçilən tələbələrimizdən beş nəfərinə Azərbaycan Təhsil İşçiləri Azad Həmkarlar İttifaqı Respublika Komitəsinin (ATİAHİ RK) təsis etdiyi 300 azn məbləğində adlı təqaüd təqdim edilib. Həmin tələbələr aşağıdakılardır:

*1) Əyyubov Cavidan Xaliddin oğlu – Tarix və coğrafiya fakültəsi, IV kurs*

*2) Əsgərov Kərim Habil oğlu – Kimya və biologiya fakültəsi, II kurs*

*3) Məmmədli Çinarə Rizvan qızı – Filologiya fakültəsi, III kurs*

*4) Əhmədova Tükəzban Malik qızı – Fizika fakültəsi, IV kurs*

*5) İsgəndərova Ləman Hüseyn qızı – İbtidai təhsil fakültəsi, II kurs*

Təqaüdə layiq görülən hər bir tələbəmizi təbrik edirik.

## ADPU YAP GB-nin " ADPU-ya sadiq məzunlar" adlı onlayn görüş keçirib

Mart ayının 6-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin Yeni Azərbaycan Partiyası Gənclər Birliyinin (ADPU YAP GB) Filologiya fakültə təşkilatının təşkilatçılığı ilə universitetin 100 illiyi münasibətilə keçirilən tədbirlər çərçivəsində "ADPU-ya sadiq məzunlar" adlı onlayn görüş keçirilib. "Microsoft Teams" platforması üzərindən 2 saatdan çox davam edən möhtəşəm görüşdə filologiya elmləri doktoru, professor, ADPU-nun Filologiya fakültəsinin dekanı Mahirə Hüseynova və fakültənin professor-müəllim heyəti, ADPU YAP GB-nin sədri Tərlan Ağayev və 300-dən çox tələbə iştirak edib.

Görüşdə çıxış edən prof. M. Hüseynova tələbələrlə özünün ADPU-da təhsil aldığı dövrdən bu günə qədər olan xatirələrini bölüşüb, onlarla öz dəyərli tövsiyyələrini paylaşıb. Eyni zamanda çağdaş poeziyamızın sevilən şairəsi olan professor tələbələr üçün ibrətamiz mövzularda şeirlərini səsləndirib.

Sonra digər müəllimlər də çıxış edərək ADPU ilə bağlı təəssüratlarını bölüşüblər.

Görüş tələbələrin qonaqlara sualları ətrafında müzakirələrlə davam edib.

## ADPU TGT "Düzgün magistr seçimi" adlı onlayn görüş keçirib

Mart ayının 22-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin Tələbə Gənclər Təşkilatının (ADPU TGT) Filologiya fakültə təşkilatının təşkilatçılığı ilə təlimçi, ictimai fəal gənc, Lead Education təhsil mərkəzinin direktoru və Bakı Dövlət Universitetinin müəllimi Eltac Cəbiyevlə "Düzgün magistr seçimi" mövzusunda "Zoom" platforması üzərindən onlayn formada sonuncu tədris ili tələbələri üçün görüş keçirilib.

Görüşdə Eltac Cəbiyev magistr təhsili ilə bağlı ümumi söhbətlər etmiş, öz təcrübələrini bölüşərək magistratura səviyyəsinə imtahanlara hazırlaşmaq və ixtisas seçimi mərhələsində diqqət edilməli olan əsas məqamlar və incəliklərdən söz açıb. Təlimçi bildirib ki, əgər lazımi nüanslara diqqət edilərsə, bakalavrlar özləri sərbəst surətdə uğurlu magistr seçimini edə bilərlər.

Tələbələrin suallarını cavablandıraraq onlara öz məsləhətlərini verən Eltac Cəbiyev həmçinin bu gün pedaqoji ixtisaslaşmalar üzrə Azərbaycan Dövlət Pedaqoji Universitetinin magistraturasının öz sözünü dediyini vurğulayıb və özünün də bir neçə il öncə bu universitetin magistraturasında təhsil aldığını bildirib.



## Azərbaycandilli Vikipediyaya 28 yeni məqalə əlavə edilib

***VİKİADPU layihəsi çərçivəsində könüllü tələbələr Azərbaycanca vikipediyaya 28 yeni məqalə əlavə edib.***



Azərbaycan Dövlət Pedaqoji Universiteti Təhsil Könüllüləri İctimai Birliyinin (ADPU TKİB) Qorqud Vikipediya Metodiki Klubu (QVMK) ilə birgə ADPU tələbələri üçün təşkil etdikləri onlayn praktik vikipediya təlim kursu - #VİKİADPU çərçivəsində təlimlərdə vikipediyada məqalə yaratmağı mənimsəyən könüllü tələbələr, o cümlədən müəllimlər tərəfindən vikipediyanın Azərbaycandilli seqmentində Vətən müharibəsi şəhidləri, ictimai-siyasi xadimlər və elmi mövzular haqqında yeni məqalələr yaradılıb. Fevral ayı ərzində keçirilən təlimlərin ardından 30 mart 2021-ci il tarixinə olan statistikaya görə ümumilikdə Azərbaycandilli vikipediyaya 28 yeni məqalə əlavə edilib, 6 məqalədə isə əsaslı redaktələr aparılıb.

## Daun Fərqindəlik Gününə həsr olunmuş "Əsl sevgi" adlı görüş



Martın 22-də ADPU TGT-nin Məktəbəqədər təhsil fakültəsi təşkilatının təşkilatçılığı ilə Daun Fərqindəlik Gününə həsr edilmiş "Əsl sevgi" adlı görüş keçirilib. Görüşdə çıxış edən loqoped-defektoloq, Qüsursuz Nitq İnkişaf Mərkəzinin rəhbəri Esmira Qafarova Daun sindromu haqqında ümumi məlumat verib. Həmçinin görüşdə İnci Psixoloji Reabilitasiya Mərkəzinin rəhbəri Ramidə Oktay və Daun sindromlu Sofianın valideyni Nərmin Fərzəliyeva da tələbələr üçün maarifləndirici çıxışlar ediblər. Görüşün sonunda ADPU TGT Məktəbəqədər təhsil fakültəsi təşkilatının fəal tələbələrinin Daun sindromlu bir uşaqla keçirtdiyi gözəl dəqiqələrdən videoçarx təqdim edilib.

## "31 Mart - Azərbaycanlıların Soyqırımı Günü"nə həsr olunmuş görüş

Mart ayının 31-də ADPU THİK-in Riyaziyyat fakültəsi təşkilatının təşkilatçılığı ilə "31 Mart - Azərbaycanlıların Soyqırımı Günü"nə həsr olunmuş görüş keçirilib. Görüşdə Riyaziyyat fakültəsinin dekanı dosent Araz Fərəcov, Azərbaycan tarixi kafedrasının dosenti, tarix üzrə fəlsəfə doktoru Elman Mirzəyev, Ümumi tarix və tarixin tədrisi texnologiyası kafedrasının baş müəllimi, tarix üzrə fəlsəfə doktoru Taleh Cəfərov, Azərbaycan tarixi kafedrasının baş müəllimi Nəbi Əsədov və ADPU THİK-in sədri, tarixçi, dosent Vurğun Məmmədov tələbələr üçün bu faciələrlə bağlı ətraflı məlumat vermiş, xalqımızn qan yaddaşının gənc nəslin yaddaşında daim yaşamalı olduğunu vurğulayıblar.

Tədbirdə 31 Mart soyqırımına həsr olunan videoçarx izlənilib və Riyaziyyat fakültəsinin birinci tədris ili tələbəsi Aydan Ağalarzadə soyqırımına həsr olunan şeir səsləndirib.



Tiraj - 500
Şəhadətnamə - № 191

# GƏNC MÜƏLLİM QƏZETİ

ADPU 100

## STEAM təhsili nədir?

*STEAM – Elm, Texnologiya, Mühəndislik, İncəsənət və Riyaziyyatın birləşməsi nəticəsində yeni ideyaların reallaşdırılması, cəmiyyətdə müxtəlif problemlərin həllinə kömək edə biləcək təhsil yanaşmasıdır. STEAM təhsilalanlarda tənqidi yanaşma, yaradıcı düşünmə, qazanılan biliklərin müqayisəli şəkildə anlaşılması, yaradıcı formada yeni layihələr əsasında biliyin möhkəmlənməsi, əməkdaşlıqetmə və s. kimi XXI əsr bacarıqlarını formalaşdırır. STEAM fənləri ayrılıqda öyrətmək əvəzinə, onları real dünyadakı tətbiqlərə əsaslanan vahid öyrənmə modelində birləşdirir.*

### İnkişaf etmiş ölkələrdə STEAM təhsili

STEAM təhsili dünya təhsil sistemində keyfiyyətin yüksəldilməsi ilə bağlı bir çox ölkələrin diqqətini cəlb edir. Məsələn, ABŞ təhsil sistemində məktəbəqədər yaş qrupundan başlayaraq XII sinfə qədər bütün səviyyələrdə inteqrasiya olunmuş STEAM proqramı tətbiq olunur. Bundan əlavə, bəzi ölkələrdə (ABŞ, Sinqapur, İsrail, Türkiyə və s.) xüsusi STEAM məktəbləri, STEAM mərkəzləri yaradılıb.

### STEAM şagirdləri həyata hazırlayır

STEAM təhsil metodu şagirdlərə beş sahənin – elm (science), texnologiya (technology), mühəndislik (engineering), incəsənət (art) və riyaziyyatın (math) birgə və inteqrasiya olunmuş şəkildə tədrisi ideyası üzərində qurulub. STEAM kurikulumu fənlərarası, praktik və tətbiqi dərslərdən ibarətdir. STEAM təhsili praktik məşğələlər vasitəsilə elmi, texniki biliklərin gündəlik həyatda tətbiqini şagirdlərə göstərir. Bu yanaşma şagirdlərə mühəndislik səriştələri öyrədir, real həyatda problemlərin həlli zamanı tətbiqini aşılayır.

### Komanda şəklində iş

Şagirdlərdə düşüncə və təfəkkürü daha da dərindən formalaşdırmaq layihənin əsas məqsədlərindən biridir. Hədəflərdən biri də şagirdlərdə istehsal təfəkkürünün formalaşmasıdır. Yəni, şagird qarşısındakı alətin necə hazırlandığını, hansı materiallardan istifadə olunduğunu düşünərək, sual verərək öyrənmək bacarığına malik olmalıdır. Şagirdlər birgə işlədiyi vaxt verilən alətlərlə prototiplər yarada bilir. Sonra şagirdlər bunu konveyr üsulu ilə bazarda necə hazırlamaq lazım olduğunu düşünürlər. Şagirdlərin komanda şəklində işləməsi də əsas prinsiplərdəndir. Çünki bu layihə əsaslı öyrənmədir. Məsələn, riyaziyyatı daha yaxşı bilən şagird istehsalın riyazi tərəflərini analiz edirsə, rəsm bacarığı olan digər şagird isə onun dizayn işini görür. Beləliklə, komanda şəklində görülən iş sayəsində mükəmməl nəticə ortaya çıxır. Bu, həm də fənlərarası inteqrasiyanı önə çıxarır.




### Azərbaycanda STEAM təhsili

XXI əsr müasir texnologiyaların, yeni elmi yanaşmaların, ixtiraların sürətlə inkişaf etdiyi dövrdür. Bu ixtiraları yaradanlar isə müasir təhsil modellərinin yetişdirdiyi insanlardır. Bu baxımdan da günün məzunu müasir tələblərə cavab verən, əmək bazarında özünü doğruldan şəxslər olmalıdır. Elə bu məqsədlə də Təhsil Nazirliyi 2019-2020-ci tədris ilindən başlayaraq Heydər Əliyev Fondunun dəstəyi ilə "STEAM Azərbaycan" layihəsinə start verdi.

Layihənin keçirilməsində əsas məqsəd respublikanın ümumtəhsil məktəblərində təhsil alan şagirdlərdə XXI əsr bacarıqlarını-kreativlik, əməkdaşlığın inkişaf etdirilməsi, müxtəlif proqramlaşdırma dillərini tətbiq etməklə müasir İKT avadanlıqlarından istifadə edə bilmə qabiliyyətlərini yüksəltməkdir. STEAM metodologiyalarının əsasında duran layihə əsaslı öyrənmə (PBL), təhsilalanların müasir cəmiyyətin problemlərini araşdıraraq müxtəlif həll yollarını müəyyənləşdirmək xüsusiyyətini artırır.

### Məktəblərdə STEAM dərsləri

Layihənin tətbiq olunduğu bütün təhsil ocaqları maddi-texniki baza ilə təmin olunub, kadr hazırlıqları həyata keçirilib. Hazırda Bakının 42 məktəbində (biri özəl məktəb olmaqla) STEAM dərsləri tədris olunur. 2020-2021-ci tədris ilində layihə ölkə üzrə 141 ümumtəhsil məktəbində 6 və 7-ci sinif şagirdləri olmaqla 933 sinif və 24542 şagirdi əhatə edəcək. Yeni tədris ilində həftədə 2 saat olmaqla təhsilalanlarda qurma, yaratma, müxtəlif layihələrin reallaşdırılması, 3D printerlərdə çap, micro:bitlə proqramlaşdırma və tətbiqi prosesləri, CNC lazer kəsiciləri, pilotsuz uçan hava aparatları (tədris dronları) üçün hazırlanmış kurikulum üzrə STEAM dərslərinin tədrisinə başlanılacaqdır.

### STEAM-ın əhatə dairəsi genişləndirilir

2 ay öncə Şirvan STEAM mərkəzinin açılışı olub. Mərkəz STEAM məzmununa uyğun lazımi innovativ texnologiyalarla tam təmin olunub. Gəncə və Quba şəhərlərində isə bu cür mərkəzlərin layihələndirilməsinə başlanılıb. Bu mərkəzlərin sayının 10-a çatdırılması nəzərdə tutulur. Layihə hazırda 147 ümumtəhsil məktəbdə tətbiq olunur və 2500-dən çox şagird, 800 müəllimi əhatə edir. ADPU da hazırda STEAM təhsili üzrə Təhsil İnstitutu ilə əməkdaşlığa başlayıb.

### Layihə bəhrəsini verir

2020-ci ilin mart ayında COVID-19 virusunun yayılması ilə əlaqədar təhsil müəssisələrinin fəaliyyəti müvəqqəti dayandırılanda layihə heyəti mövcud tibbi ehtiyacların qarşılanması məqsədilə bir sıra təşəbbüslərin icrasına başlamışdır. Tibbi ləvazimatların, ayrı-ayrı cihaz və avadanlıqların müxtəlif detallarının 3D printerlər vasitəsilə sınaq istehsalına start verilmişdir. Sınaq mərhələdə tibbi personal üçün üz qoruyucularının istehsalı uğurla tamamlanmış, gündəlik istehsal sürəti 150 vahiddən 550 vahidə çatdırılmışdır.

## BAŞSAĞLIĞI

*Yola saldığımız mart ayında ADPU kollektivi və Azərbaycan elmi-pedaqoji mühitinə bir neçə ağır itkilər üz verib. Belə ki, son ayda ADPU-nun 2 müəllimi, 1 əməkdaşı və 1 tələbəsi haqq dünyasına qovuşub. ADPU-nun rəhbərliyi və kollektivi adından mərhumların ailələrinə dərin hüznlə başsağlığı verir, onların vəfatından kədərləndiyimizi bildiririk. ADPU ailəsinin dəyərli üzvlərinin xatirəsi universitet kollektivinin qəlbində həmişə yaşayacaq.*

*Allah Rəhmət Eləsin !*


Tarixçi-alim, dosent Dilavər Əzimli


Müəllim Hikmət Qəhrəmanov


Quba filialının tələbəsi Şəbnəm İsmayılova


Laboratoriya müdiri Qənirə Cabbarova



Qəzet "Gənc Müəllim" qəzetinin redaksiyasında yığılıb, səhifələnib və "Azərbaycan Nəşriyyatı"nda çap olunub. Sifariş №: 608

Ünvan: Bakı şəhəri, Səbail rayonu, Ü.Hacıbəyli küçəsi, 68 / Əlaqə: +994 50 868 08 33 / Qəzetdə qeyd edilən faktlara görə redaksiya məsuliyyət daşımır.